Və ja
Varlıkdan jaz bizə, joklykdan jazma!
Xalkımıza dərin bir kyjy kazma!
Ətrafına bir bak, jolyn azma
Qi baharın sənin xəzana bənzər.

dejə ilq çıkışda bylynandyr. Onyn jeni şeirlərində muştərəq həjat ilə baglı olan ictimai hissələr, zalımlara karşı, saglam bir qin və mubarəzə həvəsi vardyr. Byndan başka Nəzərli, M. Arif, Fevzi, Adil Nəcdət, Ə. Husejn zada qibi proletar şairləri mejdana ƣəlməqdədur. Kızıl kələmlər cəmijjəti namilə adlanan ədəbi təşqilat, Azərbajcan 'arixi-ədəbijjatında bəjuq bir mevke dytmakdadyr. Və bizə proletar ədəbijjatının ƣələcəq inqişafına kət' ymydlar verməqdədur.

*SYALLAR:*

*1 — Əsqi zijalılar bizə nə nəzərlə bakırdılar?*
*2 — Proletar ədibləri hansı məfqyrədə işləjirlər?*
*3 — Azərbajcandaqı ƣənc ədəbijjatçılardan hansılarını bilirsiniz?*
*4 — Bynlardan ƣələcəqdə nə ymyd ƣozləjiriq?*

**Azərbajcan proletar şairi**
**Sulejman Rystamzada.**

Sulejman Rystamzada 1906-cı ildə Baqı şəhərində dogylmyşdyr. Atası dəmirçi oldygyndan, evladına da by sən'əti øjrətməq istəmişdur. Bynyn uçun atası ilə barabar dəmirçiliq sənətində çalışmışdyr. Yşaklıgı zamanında gəzet, qitab, şeir və qiçiq heqajələr okymagı çok sevərmiş. Bir tərəfdən vucydyndaqı zəifliq, o biri tərəfdən də elmə olan həvəsi, nihajət ony təhsilə vadar edər.

1921-ci ildən ƣənclər ittifakına daxil olyr və 1922-ci ildən də mətbyat sahəsinə kədəm kojyb, gəzet muxbirliƣi ilə işə başlar. Ilq dəfə jazdıgı şeirlər, 1923-cu ildən çıkan «Məarif və mədənijjət» (indi: inkilab və mədənijjət) zyrnalında dərc edilir. 1924-cu ildən e'tibarən «Ƣənc işçi» gəzetəsində komsomol həjatını təsvir edən şeirləri jazar. 1925-ci ilə qibi jazdıgı şeirlərində bir kədər duşuƣunluq ƣorunur. Laqin 1925-ci ildən sonra, jeni həjat cəbhəsinə atılmış, jeni ahənƣlər ilə şeirlər jaradır. Azərbajcan və başka Şyra cumhyrijjətilərində nəşr edilən məcmyə və gəzetlərin çokynda iştiraqa başlar. Jazdıgı şeirlərdən bə'ziləri ƣurcu, erməni və rys dillərinə tərcumə edilir.



Halı-hazırda Azərbajcan proletar jazıçıları cəmijjətində çalışmakdadyr. Jeni və ƣənc proletar şairi olan Sulejman Ryrstamzada, mədəni məarif cəbhəsində və təsərrufat sahəsində olan muvəffəkijjətlərimizi jazılarında ƣostərməqdədur. Azərbajcanın və Kafkaz daglarının təbii ƣozəlliqlərini ƣostərməqlə barabar, kadınların da çadraları atıb jeni həjata ƣirmələrini təbiig edir.

*SYALLAR:*

*1 — Sulejman Rystamzada harada və nə vakt dogylmyşdyr?*
*2 — Hansı ajilədə bojumuşdur?*
*3 — Onyn təhsilinə səbəb nə oldy?*
*4 — By halda nə işə məşgyldyr?*
*5 — Ədəbijjatda nə qibi əsərlər jaradır?*
*6 — O, hansı jolda çalışır?*

**Demjan Bedninin muxtəsər tərcuməji-halı.**

Demjan Bedninin əsil adı Jefim Aleksejeviç Pridvorovdyr.

1883-cu ildə Kybovka qəndində dogylmyşdyr. Atası velikorys, anası isə, ykrajnalıdyr. Yşaklık zamanları ata-anasının həjatındaqı ajrılık, byna çok əzijjət vermişdur.

1825-ci ildə atası Leningrad şəhərində ryhani məqtəbində xidmətçi, vagzalda hammal və sonra zavodda işçi olmyşdyr. Anası isə Kybovka qəndində jaşajırdı. Demjan 2 jaşından 7 jaşına kədər atasının janında şəhər həjatı ilə, 7 jaşından 13 jaşına kədər anasının janında qənt həjatı ilə jaşamışdyr. Atasının janında iqən ipəq fabriq-zavod və işçi həjatı byna çok tə'sirlər etmişdur. Qəntdə oldygy zaman, qəndin avamlıgı, pijanlıkla məşgyl olmaları, həqumətin zulumu və sajirə hamısı Demjanın əsəblərinə dokynyrdy. Qəntlilərə bəjuq adamlar qibi məsləhət verir, ərizələr jazırdı.

Sonra Demjan, idarələrin birində jazıçılık vəzifəsini alır. Byndan da butun qənt həjatını və qənt əhvali-ryhijjəsini øjrənə bildi. Demjan ta yşaklıgından əsqərliƣi və qənt həjatını dərindən duşunurmuş. Sonra jazılarının bir çoky əsqər və qənt həjatına ajid olmyşdyr.

Belə təəssurat altında Demjanın təhsil zamanları başlar. Məqtəb təhsilinə başlamadan, atasından okymasını øjrənmişdi. Sonra Demjanı Kybovkada olan qənt məqtəbinə kojdylar. Məqtəbi son dərəcə sə'j ilə və parlak bir syrətdə bitirdi. Kiraət və mutaləə onyn sevimli məşgələlərindən idi. 13 jaşında iqən imtihan verərəq, hə-

ƣumət hesabьna hərbi feldʒerliq məqtəbinə daxil oldy. By məqtəb Demjanьn həjatьnь dəjiʒdirdi. Onda bir çok jakʒь tə'sirlər ojatdь. Təmizliq, ictimai və mədəni həjat jollarьnь byradan ɵjrəndi. Rys ədiblərinin əsərlərilə daha jakьndan tanьʒ oldy və qiçiq ʒeirləri jazmaƣa baʒladь.

17-jaʒьnda məqtəbi bitirdi və hərbi feldʒerliq vəzifəsində kaldь. 21-jaʒьnda hərbi vəzifədən azad olmak və təhsilini artьrmak həvəsinə duʒdu. Ciddi imtihana hazьrlaʒьb 1904-cu ildə Leningrad darulfunynynyn tarixi-ədəbijjat ʒɵ'bəsinə daxil oldy.

1905-ci il tələbələr hərəqatь onda canlь bir inkilab məfqyrəsi jaratdь. Tələbələrin inkilabь təʒqilatlarьnda iʒtiraq etməƣə və ɵzɵzunə «qim ilə ƣetməlidur?..» dejə syallar verməƣə baʒladь. 1905-ci li inkilabь boƣylarak irticaьn ƣetdiqcə artmasь, bynyn həjatьna daha da artьk tə'sir etdi.

## Demjanьn ədəbi fəalijjəti.

Darulfunynyn həjatь ilə ədəbi fəaijjətə baʒajan Demjan, 1908 və 1909-ncy illərdə javaʒ-javaʒ ɵzunu ƣɵstərməƣə baʒladь. Tələbə zyrnalь olan «Rysja sərvəti» məcmyəsində birinci ʒeirlərini byrakdь. Iqi ildən sonra jarьm ƣizli bolʒeviq gəzetələrində iʒtiraq etdi. Demjan da irtica illərinin vəhʒilərini təsvir edən Tolstoj, Andrejev, Korolenko və sajirəjə koʒyldy.

1910-1911-nci iəllrdən, Lenin və gejri joldaʒlarьn ədəbijjatlarь ilə tanьʒ oldy. Bolʒeviqlərin naʒiri-əfqari olan «Zvezda» və «Pravda» gəzetələrini marakla okydy. Bynlarьn tə'siri altьnda ilham almьʒ ƣənc proletar ʒairi Demjan, ilq bolʒevizm ryhynda jazьlmьʒ ʒeirlərini by gəzetələrə ƣondərib ɵzu də mətbəədə təb' etməq iʒində iʒtiraq etdi. 1912-ci ildə joldaʒ Lenin ilə tanьʒ olyb gəzet idarələri hakkьnda bə'zi ʒiqajətlərdə bylyndy. Lenin də Demjanьn jazьlarьnьn byrakьlmasь hakkьnda təʒəbbuslər etdi. By zamandan sonra Demjan firkənin rəsmi muhərriri olyb kaldь.

### *SYALLAR:*

*1 — Demjan harada anadan olmyʒdyr?*

*2 — Onyn çocyklyk həjatьnь təsvir edin.*

*3 — Onyn cavanlьƣьnь təsvir edin.*

*4 — Demjanьn ədəbi fəalijjəti hansь zamandan baʒlar?*

*5 — Demjanьn sijasi və ictimai iʒçiliƣi nə zaman baʒlar?*

*6 — Demjan Bedninin xidmətlərini sajьn.*



## Baʒ quçə.

Çevirəni: **M. S. Ordybadı**

Demjan Bedninin «Baʒ quçə» adlь jazьlarьndan bir parça.

Baʒ quçəjə çьkdь, çirqin, mənhys fəhlələr,
Zandarmalar cəzalarьn lazьmьnca verdilər.
— Sevƣili Don kazaklarь çok jakʒь iʒ ƣɵrdulər.
— Ʒiarlarьn ƣɵrdunuzmu?
— Əvət bir zəhər qibi.
— Kara qirvə çəqilirqən hədələjirdi korkydyrdy jenə də.
— Doƣrydyrmy, iʒçilərdən kyrban çokdyr quçədə?
— Kyrban... Javrym iʒ kyrbansьz olyrmy?
— By qəmli dərs verəcəqmi bir mənfəət onlara.
— Verəcəqdur onlar uçun axьr by dərs bir bəla.
Ajnalь camoqanlar parьldajьr tazadan,
Iʒçilərin kanlarьndan təmizlənmiʒ xijaban.
Baʒ quçədə tazalandь hurmətli qinli danьʒьk.
Akʒamlarь atəʒindən ʒəhri sarmьʒ bir ьʒьk.
Orda jenə təmiz ƣejinmiʒ mutəfərrik unsurlər.
Dodaklarьn tərpədərəq, ajaklarьn surtərəq,
Onlar alçak laubali bir syrətdə ƣəzərəq,
Mohqəm ymyd bəsləjir qi, «ədəbsizlər» qolələr,
Ɵz qoləliq taleinə kapьlarak səbr edər.
Zənn edirlər: əzilmiʒ, atьlmьʒ, artьk isjan jaratmaz.
Parçalanmьʒ dalƣa qibi ƣeri dɵnməz kajьtmaz.
Jenidən. . .
Jenidən
Çuruq əsas baʒ əjər
Aƣьr divar yçyb duʒər dibindən.
— Al!
— Al!
— Bir-iqi —
Kuvvətlə
— Bir-iqi!
— Hummətlə!
— Hucym kьl!
— Parla 17-nci il
— Orda qimdur?
— Orda qimdur?
Için cəqər hurqmuʒ halda: «dajan dyr».
— Qimdur həris cəllada?

— Byrada boз kyrзyn ata!
Orda qimdur jalaklanan, jalvaran?
Koj rədd olsyn agalardan paj yman.
-- Bir-iqi!
— Kuvvətlə!
— Bir daha!
— Bir daha!
Jaltaklar heç bizə lazım dejildur.
Haqimijjət butun iзçi həkkidur.
-- Bir-iqi!
-- Hummətlə!
-- Hucym kıl!
Bizləri qim mevkeindən koparar?
-- Belə kuvvət qimdə var?
Proletar təpiqinin altında
Baз quçədə bir inilti bir səda!!

## Aj baзı bəlalı fəhlə.

**Sabir.**

Nə sokylmysan araja, a baзı bəlalı fəhlə?!
Nə xəjal ilə olybsan, belə iddəalı fəhlə?
Sənə dinmədiqcə fəhlə, azıxıb jolyn çaзırsan,
Kapıda dajanmajıb da zala dogry dırmaзırsan,
Kara fəhlə oldygynda, bəju-xanla çylgaзırsan
Nəjə bizdə qormujursən, by kədər cəlalı fəhlə!
Nə çıgır-bagır edirsən, jorylyb ysanmajırsan,
Ədəb ilə ez məkamın, tanıjıb dajanmajırsan,
Hələ qehnə paltarından, kızarıb ytanmajırsan
Baзına kojyb qəlirsən, jeqə bir motalı fəhlə!
Byna bak, by sir-sifətlə, danıзır da bir ibarə,
Qezum agrajır edəndə, by kırılmıзa nəzarə,
Qətirib byrakdı qimlər, byları bizim dijarə
Nə bilim haralı qasıb nə bilim haralı fəhlə!
Belə idi adət əvvəl: bejə jalvarardı qasıb,
Nucəbaları qerəndə, ajaga dyrardı qasıb,
Iqi kat olyb ədəblə, bəjə baз vyrardı qasıb,
Var idi vəfalı qasıb, var idi həjalı fəhlə!
Dəjiзib zəmanə indi, dolanıb butun umyrat
Ajagı çarıklılar da, qəlib istəjir musavat.
Belə əsrdə məiзət, bizə xoз qeçərmi hejhat



Ajılıb jatan cəmaət, qez açıb kapalı fəhlə!
Ada fəhlə sən qet əlləз, sana qunlərin aj olsyn,
Qet olarla sez danıз qim, sənə fəkr də taj olsyn,
Bəзərijjət aləmindən, nəjinə qerə paj olsyn
By dejilmi baз kylagın, a baзı havalı fəhlə!
Bəзərijjət axtarırsan, hanı rutbəvu-cəlalın?
Mədənijjət axtarırsan, hanı pylu-mulqu-malın?
Əzəmijjət axtarırsan, hanı xalisən mənalın?
Hanı takə-takə зalın, a cırık çyxalı fəhlə!
Danıзırsan azgın-azgın, hanı kəsri-zərniqarın?
Hanı Anna təq barıзnan? Hanı Sonja təq niqarın?
Hanı məclusu kymarın? Rufəkaju mejqusarın?
Hanı nəзəji xumarın? A kalın kafalı fəhlə!

## Sabirin tərcuməji-halı.

Mirza Ələqbər Sabir Tahirzadə 1862-ci ildə Зamaxı зəhərində dogylmyзdyr. 8 jaзında məqtəbdə okydygy zaman mollaların zylmyny qestərən:

Dytdym orycy irəmazanda
Kaldı iqi qezlərim kazanda
Mollam da dəjur jazı jazanda

зeirini jazmıзdyr. 12-jaзında Hacı Sejjid Əzimin məqtəbinə qirmiз və ez ləjakətini qestərdiqi uçun, Sejjid Əzim bynyn okymasına çok əhəmijjət vermiзdur. Bir kədər turqcə və farsca ejrəndiqdə, atası Sabiri məqtəbə qetməqə byrakmajır, ez duqanında ticarət ilə məзgyl olmaga məcbyr etmiзdur. 23 jaзında Irana qedib, bir çok зəhəri qəzmiз və təqrar Зamaxıja kajıtmıзdyr. Bir neçə vaktdan sonra jenə də Irana qetmiз isə də, atasının olum xəbərini alıb, Зamaxıja kajıtmıзdyr. Bojuq bir qulfət sahıbı oldygyndan, sabyn biзirməq ilə ajiləsini dolandırırmıз və əlinə duзən beз on dəkikə vaktını mutaləə və зeir jazmaga sərf etmiзdur.

1901-ci ilə kədər həjatı çok agır qeçmiзdur. 1901-ci ildə зairlər və zijalılar ilə tanıз olaraK, ilq jazıları qah mərsijə, nevhə, qah da kəsidə və gəzəllərdən ibarət olmyзdyr. Nihajət Molla Nəsrəddində iзtirakı, şabirin tanınmasına vasitə olmyзdyr. Sabir зairliqdən baзka, saglam bir iradə sahıbı da olmyзdyr. By iradə sajəsində alimlərin və mollaların karзısında dyra bilmiзdur. Həcvdə Sabir qibi jeni ədəbijjat cıgırı açan bir зair olmamıзdyr. Əməqçi həjatına:

By çərxi fələq tərsinə devran edir indi,
Fəhlə də ezun daxili insan edir indi.

ʒeirilə jakьnlaʒdьƣьnь ƣɵstərmiʒdur. Kadьnlarьn əsarətini, fəhlə-qəntlilərin avamlьƣьnь, mulqədar və kapitalistlərin zylymlarьnь çok ƣɵzəl təsvir etmiʒdur. Sabir həjatьnda ƣɵrduƣu həkikətləri, jazmakdan çəqinməmiʒdur. Xanь, mollanь, padʒahlarь, pristavlarь, koçylarь həcv ilə jazmьʒ və musəlman aləmində olan elmsizliq, avamlьk, mevhymat və sajir əxlak və adətlərin hamьsilə ciddi mubarəzə aparmьʒdyr.



M. Ə. Sabir

1910-cy ildə Ʒamaxьda ony ɵldurməq istədiqlərindən, Baqьja ƣəlib Balaxanь məqtəbində turq və fars lisanь muəllimi olmyʒdyr.



Həjatьn acь zərbələri altьnda jaʒajan Sabir, cijər, xəstəliƣinə dytylyb 1911-ci ildə vəfat etmiʒdur. Vaktilə Sabirə kijmət verilmədiƣi halda, indi əməqçilər ɵz ʒairini tanьjьr və onyn namьna hejqəllər, ƣutubxanalar, kylyblar, məqtəblər açьr.

*SYALLAR:*

*1 –Sabir harada və hansь tarixdə dogylmyʒdyr?*
*2 - Harada təhsil almьʒdyr?*
*3 -Atasь Sabir hakkьnda nə edirdi?*
*4- Sabir nə vakt tanьnmaga baʒladь?*
*5- -Sabir qimlər ilə mubarəzə aparьrdь?*
*6—Əməqçilər Sabir uçun nə jadiƣar byrakdьlar?*

## Əqinçi.

**Sabir.**

Bəsdur, by kədər baʒlama fərjadə əqinçi!
Kojma ɵzunu tulquluƣə adə əqinçi!
Bir uzrlə hər ƣundə ƣəlib dyrma kapьmda;
Jalvarma mənə bojnyny qəc byrma kapьmda
Ƣahь baʒьna, ƣahь doʒunə vyrma kapьmda.
Ləgv olma, ədəb ƣɵzlə by mə-vadə əqinçi!
Lal ol a ƣedə baʒlama fərjadə əqinçi!
Xoʒ qeçmədi il çollujə, dehkanə nə borcym;
Jagmadь jagьʒ, bitmədi bir danə nə borcym;
Əsdi kara jel çəltiƣə, bostanə nə borcym;
Ƣetdi mənə nə fəhləliqin badə əqinçi!
Lag-lag danьʒьb baʒlama fərjadə əqinçi!
Aldь doly əldən səru-samanьnь nejlim;
Ja inqi çəjirtƣə jedi bostanьnь nejlim;
Verdin qeçən il borcyna jorganьnь nejlim;
Ol indi palas satmaga amadə əqinçi!
Lal ol a balam baʒlama fərjadə əqinçi!
Sɵz açma mənə çok çalьʒьb az jeməƣindən;
Canьn bə cəhənnəm qi, ɵlursən deməƣindən;
Mən ƣɵzləmərəm, bygda çьkar ver bəbəƣindən.
Çəltiq də ƣətir; arpa da, bygda da əqinçi!
Joksa sojaram lap dərini adə əqinçi!
Sən hej de jokymdyr, çьkarьb canьnь allam;
Vallahь ojyb dideji-ƣirjanьn allam:
Ʒallaga dytyb pejqəri-urjanьnь allam;
Ɵjrəʒməmisən ət jaga dunjadə əqinçi!

Lag-lag danьşьb başlama fərjadə əqinçi!
Çutçu babasan bygdanь ver, darь jejəfsən;
Sy olmasa kьşda əridib karь jejərsən;
Daşdan jymyşak zəhr nədur marь jejərsən.
Ɵjrəşməmisən ət jaga dunjadə əqinçi!
Hejvan qibi omr ejləmisən sadə əqinçi!
Laqin mənim insanlьk olyb vəz'i-madarьm;
Bəjzadajam aşajişədur cumlə kərarьm;
Mejsiz, məzəsiz olyr şamu-naharьm.
Lьtə belədur haləti-bəjzadə əqinçi!
Bəjzadələrin rəsmi bydyr adə əqinçi!



Maksim Gorqi.

## Maksim Gorqinin tərcuməji halь.

Maksim Gorqinin əsil adь, Aleqsej Maksimoviç Peşkovdyr. 1868-ci ildə martьn 29-nda Nizni Novgorod şəhərində dogylmyşdyr. Iqi ildən sonra atasьnьn mə'myrijjəti səbəbilə Həştərxana ƣəlmiş, atasь orada vəba xəstəliƣindən olmuşdur. Anasь jenidən Gorqi ilə Nizni Novgorada kajьtmьşdyr. 1875-ci ildə anasь da vərəm xəstəliƣindən vəfat etmişdur.

Qimsəsiz kalan Gorqinin bir çəqməçi janьnda şaƣirdliƣə ƣirməqdən başka bir çarasь kalmamьşdь. 1884-cu ildə, okymak ucun Kazan şəhərinə ƣetmişsə də, ancak okyjamamьş və çorəqçi şaƣirdliƣinə ƣirmişdur. Kazanda bir neçə tələbələr ilə ulfət baglajьb, onlarьn inkilabi təşqilatlarьnda işləməƣə başlamьş. Byrada sijasi, iktisadi və ictimai ədəbijjat ilə tanьş olmyşdyr. 1888-ci ildə inkilabçь və xalkçь



Romans ilə tanьş olyb, onyn təbligat məksədilə bakkal duqanьnda şaƣirdliq etmişdur. 1889-da birinci dəfə həbsə alьnmьş və iqi ildən sonra byrakьlmьşdyr.

Gorqi həbsdən çьkdьkdan sonra Novgorody tərq edərəq pijada Tsaritsinə və byradan Xersona, Xersondan Krьmn vasitəsilə Tiflisə ƣəlib məşhyr inkilabçьlar ilə tanьş olmyşdyr.

1892-ci ildə Kafkaz gəzetində Gorqinin birinci heqajəsi olan «Makar çydra»sь çьkmьşdyr. Gorqi byradan isə Niznijə ƣedib, advokat Larinin janьnda işləməƣə başlamьş və məşhyr rys ədibi Korolenko ilə tanьş olyb ədəbijjat sahəsinə kədəm kojmyşdyr. Kazan gəzetəsində «Volga» adlь, Nizni Novgorod gəzetəsində «Sьgьrçьn» və «Arxip baba» adlь heqajələri çьkmьşdyr. 1893-də daimi olarak Samara gəzetəsində feljeton jazmaga başlamьş və inkilabçьlar ilə əlakədə bylynmyşdyr. Onlara mumqun kədər jardьm etmişdur. 1901-ci ildə Peterbyrgda çьkan «Zizn» məcmyəsində «Fьrtьna elçisi» adlь əsəri çap edilmişdur. Peterbyrgda iqən intibalnama byrakmak ustundə həbs edilirsə də, ciƣər xəstəliƣinə dytyldygyndan Tolstojyn təşəbbusu ilə azad edilib Krьma ƣondərilir.

1902-ci ildə Rysjada Gorqi bɵjuq ad kazandьgьndan, Rysja Fənni Akademijasьna fəxri uzv seçilir. Laqin az vaktdan sonra, çarьn tələbilə uzvluqdən çьkarьlьr. 1905-ci ildə jenidən dytylyb kəl'əjə salьnьr. Kəl'ədə iqən «Ƣunəş çocyklarь» əsərini jazmьş. Gorqi iqi aj həbsdə kaldьkdan sonra—1906-da Avropaja, oradanda Amerikaja ƣedir. Amerikada, Fransanьn çara borc verməsinin əlejhinə «Ƣɵzəl Fransa» və «Ana» adlь çok bɵjuq heqajələrini jazьr. 1906-da Italjaja ƣəlib, Kapridə saqin olyr. By zaman Lenin də Cinevədə oldygyndan iqisi biri-birilə məqtyblaşьrlar. Gorqi bolşeviqlərin naşiri-əfqarь olan «Jyldyz» və «Məarif» gəzetələrində işləməƣə başlar. 1913-də əfvi-umymi munasəbətilə Rysjaja ƣəlir. 1922-ci ildə qɵhnə xəstəliƣi şiddət etdiƣindən, Avropaja ƣedər; halь-hazьrda Italjada saqindur. Laqin hər zaman Şyralar əməqçilərilə əlakəsini saklamakdadyr. Həmişə Şyra həjatьndan maraklanьr, Şyra gəzet və məcmyələrində iştiraq edir. Halь-hazьrda 10 illiq muvəffəkijjətlərimizi ƣorməq və ony butun dunja karşьsьnda ƣostərməq, proletarlarьn hər bir işi jaratmaga iktidarlarь oldygyny isbat etməq uçun Rysjaja ƣəlmişdur.

### *SYALLAR:*

*1—Maksim Gorqi nə məsləqdə bir ədibdur?*
*2—Əvvəlcə nə iş ilə məşgyl idi?.*
*3—Qɵhnə hɵqumət Maksim Gorqijə nə etdi?*

## Həbsxana.

**Maksim Gorqi**

Зəhər ustundəqi bylyt ony dymanlı, pərdə qibi sararak, palçıklı jerə xırda jagıз səpələjirdi. Jan-jana duzulmuз polis nəfərləri ilə zəncir qibi aralıga alınmıз arvad və qiзilərdən ibarət bəjuq bir insan dəstəsi, evlərin daз divarlarına surtulə-surtulə javaз-javaз hərəqət edirdi. By dəstənin baзı ustundə qizlin bir səs çınlajırdı. Boz alaca karanlık çohrələr, qilidlənmiз çənələr, mə'jys və gəmli nəzərlər... Qimisi oz qucsuzluqunu qizlətməqə çalıзarak, зaзkın-зaзkın quldugu qibi qustaxcasına zarafat da edirdi. Hərdəm bir əzilmiз həjəcan nidası, eзidilirdisə də, o nida ymydsyz və dytgyn bir səsdən ibarətdi. Sanqı by insanlar isjan vaktının jetiзdiqini və ja otmuз oldygyny hələ həll etməmiзlər. Polislərin jorgyn və kajgyly uzlərindən зərr jagırdı; jagıз damlaları bıg və зapkalarında parıldajırdı. Davasız məglyb olan insanların ustunə, jagıз ilə barabar agır-agır iri karlar japıзır, qojdən gəm gussə jagırdı.

Həjatə doldyr!—dejə qimin isə xırıldajan səsi eзidildi. Adamlar kojyn surusu qibi bir-birini basarak, akıntıja bənzər həjatə toqulur dənər. Onların narazı bagırtıları arasında kadınların da qoz jaзları, karıзık əsəbi acıklı səslər çınlajırdı. Darulfunynyn birinci kyrs tələbələrindən yca bojly, nəзəli, saglam bədənə maliq Miзa Malindin ytancak qəj qozlərilə ətrafındaqı acıklı, solgyn, зaзgın çohrələri jazıkcasına baka-baka dəstənin içərisində irəriləjirdi. Kadınların bagırtısı, əsəbi qulualər, ony həjəcana salırdı. Basa-basa bogylmak dərəcəsinə qələn Miзa, ytancak hiss altında nifrətindən aglamak dərəcəsinə qəlmiзdi.

# XVI

# SƏNAJEI-NƏFISƏ.

## Sənajei-nəfisə.

Jakзı bir mysiki eзitdiqdə ony dikkətlə dinlər və ryhymyzda bir həjəcan hiss edəriq; byndan baзka ahənq e'tibarilə bir səz eзitdiqdə, əzumuzdə bir həjəcan dyjarık. Dyjdygymyz by həjəcanlar iqi curdur: biri həzz, o biri ələmdur. Nəз'ə qətirici mysiki, dinlədiqimiz zaman, by həjəcan həzz syrətində, bir fəlaqət xəbəri eзitdiqimiz zaman hiss etdiqimiz həjəcan isə ələm syrətində olyr.

Laqin by həjəcanlar, jolda qedərqən para byldygymyzda hiss etdiqimiz məmnynijjətə və ja karnımız ac iqən əlimizə qeçən bir jeməqi jediqimizdə hiss etdiqimiz dyjgyja bənzəməz. Deməq, dyjylan həjəcanlar arasında fərklər vardyr.

Qəzəl bir sənət nəticəsi olarak, dyjylan həjəcanı, o biri həjəcanlardan ajırmak uçun, byna həjəcani-bədii dejilmiзdur. By sajdıgımız həjəcanları mejdana qətirməq uçun bir neçə vasitə vardyr. Bynlar da: rəsim, mysiki, ədəbijjat, me'marlık qibi vasitələrdur.

Həmin vasitələrin ryhymyza bədii bir həjəcan qətirməsi uçun, hər halda məharət sahıbı bir adamın əlindən çıkması lazımdyr. Daha dogrysy həjəcani-bədii husyla qətirən зej, adi rəsim, mysiki, ədəbijjat dejil; bynları kijmətləndirən, sənət və məharətdur. By sənətlərə sənajei-nəfisə dejilir.

### Зeir və зair nədur?

Incə sənətlərdən biri də ədəbijjatdyr. Зeir isə ədəbijjatın bir зə'bəsidur.

Зeiri jazanlara зair adı verilir.

Зeir, insanda qəzəl bir hiss və həjəcan dogyran ədəbi parçaja dejilir. Rəssam əz kələmilə bir зeji jaratdıgı qibi, зair də əz jazısilə jeni-jeni зejlər mejdana çıkarır. Rəssamlarda qəz kuvvəsi qəsqin oldygy qibi, зairlərdə də bir зeji canlandırmak kuvvəsi artık olmalıdyr. Insanlar arasında зeir çokdan bəri vardyr. O zaman зeir indi-

qi qibi muəjjən bir syrətdə ʒəqil və kijmət almamıʒdı. Agızdan-agıza eʒidilən by ʒeirlər xalk malını larından ibarət idi. Agızdan-agıza eʒidilən by ʒeirlərin ʒairləri də bəlli dejildi.

Ɵzƣəsinin hesabına xidmət edən məfqyrəsiz ʒairlər oldygy qibi, həkiki fiqirli ʒairlər də vardyr. Birinci ʒairlərin jazıları, ali sınfın və dinin tə'riflərinə ajiddur. Bynların əsərlərindən əməqçilər heç bir fajda ala bilməzlər.

Həkiki fiqirli ʒairlər isə, xalkın həjatını, muhitini, ehtijacını ƣörənlər və ony oldygy qibi təsvir edənlərdur.

By curə ʒairlərə misal olarak, Azərbajcandan Sabiri və Mirzə Fətəli Axyndofy ƣoturməq olar.

Proletar hoqumətinin məksədləri bam-baʒka oldygy uçun, ʒairlərdən və ʒeirlərdən etdiƣi tələblər də baʒka curdur. Bizdə ʒeir, əməq və inkilab nəgmələri ilə proletarların galib olmasını, onyn jaʒajıʒını, mədənijjətini təsvir etməqdur. Bizdə ʒeirlər azad proletar hoqumətini, azadlık hukykyny, iʒçi kadınları, xalk təsərrufatını, və camaat məarifini ifadə etməlidur.

İndiqi ʒairlər tamamilə camaaatın istəqlərinə ƣirməli, onyn dililə danıʒmalıdyrlar. Proletar ʒairləri ancak, joksyl camaatın juqsəlməsi yƣrynda çalıʒır, onyn xoʒbəxtliƣinə xidmət edir, sosjalizm malınılarilə ƣeniʒ iʒçi qutləsinə duzƣun jollar ƣöstərirlər.

Ƣul, bulbul devri artık qeçmiʒdur. İndi iʒ, zəhmət, texnika və sosjalizm devridur.

*SYALLAR:*

*1—Зeir və ʒair nəjə dejirlər?*
*2—Hansı parçaları ʒeir adlandırmak olar?...*
*3—Зairlər hansı fiqirlərə xidmət edə bilərlər?..*
*4—Həkiki ʒeir və həkiki ʒair bynların hansıdyr?..*
*5—Proletar ʒairlərinin bəzəƣi nədədur?*

## Rəssamlık.

Rəssamlık, ədəbijjat, mysiki, hejqəltəraʒlık qibi sənətlərə incə sənət dejirlər. Bynların hər birinin özunə maxsys öz jeri və baʒkalıgı vardyr.

Rəssamlık dəxi incə sənətlərin bir ʒə'bəsidur. Kədim zamanlarda insanlar arasında kaba da olsa, rəssamlık vardı. Insan cəmijjəti avçılık ilə jaʒarqan, avlajacagı, avın və av əʒjalarının rəsmini çəqərmiʒ. Mısırlılar, romalılar və jynanilərdə ressamlık sənəti çok tərəkki



etmiʒdi. Orta əsrlərdə jaʒamıʒ olan Italja ƣözəl sənətləri, öz rəssamlıgını, və onyn ƣözəlliƣini by ƣunə kədər saklamıʒdyr.

Bir həkiki, bir də xəjali rəssamlık vardyr.

Həjat səhnəsində ƣorduƣu həkiki və təbii iʒləri, oldygy qibi çəqib ƣöstərən rəssamlara həkiki rəssamlar dejirlər. Xəjalçı rəssamlar isə həkiki jaʒajıʒdan aldıkları, həkiki fiqirlərin ustunə, bir də öz xəjallarında jaratmıʒ oldykları, fiqirləri ilavə edərlər.

Bacarıklı, bir rəssamın kələmindən çıkmıʒ olan bir rəsm insanda ƣözəl bir dyjgy, zevk, nəʒ'ə ojandırar. Bacarıklı, bir rəssam olmak uçun, bə'zi ryh kabilijjətlərinə: dikkət, jaddaʒ və sajirəjə malik olmak lazımdyr.

Зyra hoquməti kyrylyʒyndan sonra, hər ʒej dəjiʒdiƣi qibi, rəssamlık sənəti də dəjiʒib baʒka ʒəqilə duʒmuʒdur. İndiqi Зyra rəssamlarının bacarıklı, kələmlərindən çıkan rəsmlər qeçmiʒdəqi qibi aga sınfını dejil, inkilab mənzərələrini, inkilab dahilərini, əməq kəhrəmanlarını, və proletar xalkının ictimai həjatının muxtəlif cihətlərini təsvir edir. Bynlar incə sənətə, həkiki, həjati və təbii levhələr verməqlə jaradıcılıklarını, butun dunjaja isbat edirlər.

*SYALLAR:*

*1—Incə sənətlər nəjə dejilər?*
*2—Incə sənətlərin hansı ʒə'bələri vardyr?*
*3—Rəssamlık qeçmiʒdə və indi necədur?*
*4—Həkiki rəssamlar hansı rəssamlara dejə biləriq?...*

## Hejqəltəraʒlık.

Incə sənətlərdən biri də hejqəltəraʒlıkdyr. By sənətin tarixini əsqi Jynan və Mısır xalkında axtarmak lazım ƣəlir. Onların o zamandan kalma hejqəlləri by ƣunə kədər kalmıʒdyr. By hejqəllər by ƣun cəmijjət tarixi jaratmak uçun canlı materiallardyr.

Halı-hazırda dunjanın hər bir tərəfində hejqəltəraʒlık vardyr. Ən ƣözəl və ləjakətli hejqəltəraʒlık sənəti Italijadadyr. Qeçmiʒdə və indi də byrzyazija ölqələrində hejqəltəraʒlık o sınfın istəqlərinə yjgyn olarak ilərilənməqdədur.

Зyralar ölqəsində də hejqəltəraʒlık çok böjuq addımlarla iləriləjir. Byrada hər ʒejdən əvvəl inkilab dahilərinin, proletar rəhbərlərinin, böjuq kommynizm muəllimlərinin hejqəlləri kajrılır. Mədənijjətə və elmə xidmətçi olmyʒ adamların, əməqçi həjatını, səvə-səvə təsvir edən ʒair və jazıçıların hejqəlləri dəxi kyrylyr.

Hejqəl təqən adamlara hejqəltəraʒ adь verilir. Hejqəltəraʒlar hejqəlləri daʒdan jonar, tyncdan və ja kyrʒyndan təqərlər.

Incə sənətlər nəkteji-nəzərincə daʒdan jontylmyʒ incə hejqəllər daha kijmətdardyrlar. Bir hejqəltəraʒьn jaratmьʒ oldygy hejqəl, ondaqi sənət kuvvəsinin və kudrətinin dərəcəsini dəxi ƣəstərir.

*SYALLAR:*

*1—Hejqəltəraʒlьk haradan baʒlamьʒ və nəjə xidmət etmiʒdur?*
*2—Xarici əlqələrdə hejqətltəraʒlьgьn ƣetdiƣi joly tə'jin edin?*
*3—Bizdə hejqəltəraʒlьk nə vəzifə ƣərur?..*
*4—Hejqəltəraʒ, qimlərə dejilir?.*

## Mysiki.

Incə sənətlərin bir koly da mysikidur. Mysiki, qəhnə zamanlardan bəri insanlarьn içərisində jaʒamakdadyr. Mysiki sadəcə kьʒkьrьkdan baʒlajarak, bir çok tərəkki pilləsi atlamьʒ və by ƣunqu hala duʒmuʒdur.

Xalkьn iktisadi dəjiʒiqliqləri onlarьn kyrylyʒyny dəjiʒdiƣi qibi, mysiki sənətini də tərəkki joly ilə aparmьʒdyr. Istər qəhnə-tərəkki etmiʒ mysiki, istərsə də by ƣunqu irəriləmiʒ mysiki baʒlьca insana datlь nəʒ'ələr verməq və onyn ryhyny okʒamaga xidmət edər.

Mysiki qeçmiʒdən bəri insanlar arasьndaqь iʒ və din əsaslarьna səjqənəcəq olmyʒdyr. Vaktilə insanlar mysiki ilə iʒlər, onynla da dinə kyllyk edərlərmiʒ.

Bir sozlə insanьn jeməƣə ehtijacь oldygy qibi, mysikijə də ehtijacь vardyr. Çunqu mysiki də insanьn ryhyna gьda verir. Insanьn ryhyny mysiki kədər okʒaja bilən heç bir vasitə jokdyr. Mysikinin insanlara tə'siri oldygy qibi, hejvanlara da tə'siri vardyr. Bir çoban dudəq çalarqan, itin qanarda kyjryk bylamasь, kojynlarьn muxtəlif hərəqətləri mysikinin əsəridur. Hələ son zamanlar mysiki çalьnьrqan bə'zi bitƣilərin də xusysi hərəqətə ƣəlməsi qəʒf olynmyʒdyr.

Mysiki by kədər ƣəzəl və fajdalь oldygy halda, indijə kədər ancak varlьlarьn ryhyna xidmət edib həjatьn və təbiətin hər cur ƣəzəlliqlərindən yzaklaʒdьrьlmьʒdь. Laqin Ʒyra hequməti duzəldiqdən sonra, mysiki xalkьn malь olmyʒdyr. Minlərcə iʒçi və qəntlilər mysiki sənətindən mənfəət almaga, ona kylak asmaga, ony ƣərməƣə nail olmyʒlardyr. By iʒi ƣeniʒləndirməq uçun, hequmət iʒçi kylyblarьna və teatrolarьna hər cur mysiki alətləri byrakmьʒdyr. Iʒçilər boʒ vaktlarьnda byralarda mysikini dinləməqlə istirahat edirlər.



Indiqi Ʒyra mysikisi, byrzyazijanьn və dinin tə'sirindən çьkьb, əməq və inkilab ʒərkiləri ifadə edir.

*SYALLAR:*

*1—Mysiki ilq zamanlar necə idi və nəjə xidmət edərdi?*
*2—Mysikinin insanlara necə tə'siri vardyr?*
*3—Əsqi və jeni mysikini biri-birindən nə ilə ajьrarsьnьz?*
*4—Azərbajcanda mysiki tərəkkisinə hequmətin səji?*

## Qinonyn tarixi və əhəmijjəti.

Qino maʒьnь birinci dəfə Fransalь Ljymer tərəfindən icad edilmiʒ və birinci dəfə olarak qinomotograf iʒi byradan baʒlamьʒdyr. Fransadan sonra Amerika və Almanja tərəfindən by iʒ daha da muqəmməlləʒdirildi. O zaman qinolar hələ ibtidai ʒəqildə idi.

1906-cь ildə birinci dəfə Berlində qino-fabriq binasь tiqildi və sonra butun dunjanьn hər jerində qino teatrolarь əmələ ƣəlməƣə baʒladь. Laqin dunjada birinciliq Fransa, Italja, Almanja və Amerika filmələri əlində idi. Bynlar ɵz istehsalatьnь istədiqləri kijmətə satardьlar.

Axьrda qino-teatrolar ilə məʒgyl olanlar, bir ittifak duzəltdilər. Өzləri lenta və aparat almaga baʒladьlar. Bynynla iʒlər bir kədər asanlaʒdь.

Muharəbə zamanьnda qino iʒləri pozylyb, muharəbədən sonra jenidən tərəkki etməƣə baʒladь.

Rysjada qino iʒi birinci dəfə 1896-cь ildə Fransьz filminin fəalijjəti ilə baʒlanmьʒdyr. 1910-cy ildə Rysjada rys həjatьna yjgyn filmlər mejdana ƣəlmiʒdur. Laqin bynlarьn fəalijjəti 17-ci ildən e'tibarən jenidən pozylmaga baʒlamьʒdyr. By hal, 1920-ci ilə kədər davam etmiʒdur. 1920-ci ildən sonra ƣet-ƣedə Ʒyra qino filmləri inqiʒafa dogry irəriləmiʒdur. By ƣun son dərəcədə tərəkki etmiʒ olan Ʒyra qinosynyn umdə məksədi, Ʒyralar Ittifakьnьn proletar mədənijjətinin məhqəm usyl ilə hazьrlanmьʒ qino ləvazьmatь ilə tə'min etməqdur.

Ʒyra qino filmləri kapitalist əlqələrin qinolarь qibi zevk və nəʒə uçun jaradьlmajьr; kommynist məfqyrəsini, həkiki həjat səhifələrini ƣeniʒ iʒçi və qəntli qutləsi arasьnda jajьr və onlara inkilabi tərbijəni, sosjalizm məfqyrəsini və həkiki həjat jollarьnь ƣəstərir.

Rysja, Ykrajna, Ƣurcustan, Turqustan, Krьm, Azərbajcan, Ermənistan qibi mustəkil cumhyrijjətlərin hamьsьnda qino fabriqləri vardyr.

*SYALLAR:*

*1—Qino ilq dəfə harada əmələ ƣəlmiʒdur?..*
*2—Cahan muharəbəsi qino iʒlərinə necə tə'sir etmiʒdur?..*
*3—Ʒyralar cumhyrijjətində qino iʒləri necə kyrylmyʒdyr?*
*4—Bizim qinolar nə qibi jol dytyrlar?..*

## Teatro və onyn əhəmijjəti.

Teatro, incə sənətlərdən olan ədəbijjatьn bir ʒɵ'bəsidur. Ədəbijjat incə sənətlər içərisində bojuq bir jer dytyb jaʒajьʒ səhnəsinə bojuq numynələr verə bilir.

Teatro piesləri, haman ədəbijjat sənətinin jaʒajьʒь ƣɵstərən əsərləridur.

Teatro ictimai bir tərbijə səbəbqarь və ibrət ajnasьdyr. By ajnada hər qəs ɵz simasьnь ƣɵrə bilər. Teatro mevhymatla ortulmuʒ ƣɵzləri açьr. Xalk arasьnda jer dytmyʒ xurəfatь dagьdьr. Teatro zalьmь və məzlymy səhnədə ajdьn ƣɵstərə bilir. Həkiki həjatь ƣɵz kabagьnda canlandьrьr. Onlarь ƣəflətdə saklajan, əzən, sojan hər cur adamlarь xalka tanьdьr. Haqimlərin, kyllykçylarьn xətt-hərəqətlərini ʒiddətli syrətdə tənkid edir. Məsxərə və məzhəqə syrətində onlarьn etdiqlərini aʒqara çьkarьr.

Teatro istər ictimai, istərsə mədəni və sijasi həjatda camaata çok bojuq xidmətlər ƣɵstərir.

Teatrosy olmajan cəmijjət qor qibidur. Belə bir cəmijjətdə tɵrənən kanynsyzlyklar, tamamilə qizli kalьr.

Muhitin ləqəsini cəmijjətin uzərindən təmizləməq uçun ən ƣɵzəl vasitə teatrodyr.

Teatro ədəbi bir məqtəb, ictimai bir ocakdyr.

Kapitalist ɵlqələrin teatrosy ancak agalarьn mənfəətini ƣudur. Ʒyra teatrosy isə əməqçi xalkьn qeçmiʒ və ƣələcəƣini anlata bilən əsərlərlə mejdana atьlьr. By jolda iʒçilərə sьnьfi dyjƣy verib, onlara dogry həjat jollarьnь ajdьnlaʒdьrьr. Qeçmiʒ mulqədar və fabriqçi zylmyndan numynələr ƣɵstərir. İndiqi iʒçi həjatьnь, proletar haqimijjəti oldyƣy qibi təsvir edir.

Bynlardan ilavə teatronyn ɵzunə məxsys bir ƣɵzəlliƣi dəxi vardy.

Tamaʒaja kojylan əsərlər insanda bir mejl və həvəs ojatmazsa, ona bakьlmaz. Bynyn uçun hər bir teatro jazan jazьçь, onyn ƣɵzəlliq cihətinə artьk dərəcədə fiqir verir. By səbəbdən biz teatrolarda bə'zən aglar bə'zən ƣuləriq. By hallar ixtijarsьz olarak o əsərdəqi ƣɵzəlliqdən dogyr.



Teatro insana hiss və dyjƣy verməsilə ony ɵzunə daima cəlb edər. By cihətdən teatro oldykca kijmətli bir ʒejdur.

*SYALLAR:*

*1—Teatro nədur?..*
*2—Teatronyn əhəmijjəti nədədur?*
*3—Əsqi və jeni teatrolarьn fərki?*
*4—Teatronyn cəmijjətə nə qibi tə'siri vardyr?*
*5—Teatro jazanlar nələrə dikkət etməlidurlər?*
*6—Ƣɵrduƣumuz və bildiƣiniz teatrolarь sajьn.*

## Teatro əsərləri və nev'ləri.

Teatro əsərləri cur-bə-curdur. Bynlardan biz: drama, trazedi, opera və komedijanь tanьjьrьk.

D r a m a: olmyʒ bir əhvalatь, səhnədə butun acьlьgь ilə ƣɵstərməqdən ibarətdur. Dramalar həm nəsr və həm nəzm ʒəqlində ola bilər.

Dramalarьn məzmyny xəjali və həjati olyr. Hər halda ən ƣɵzəl dramalar, məzmyny jaʒajьʒdan alьnmьʒ olanlardyr. Drama ja faceəli və ja faceəsiz olyr. Faceəli drama, dramanьn ən mudhiʒ bir ʒəqlidur. Byrada həmiʒə kanlь çarpьʒmalar qibi, korkyly ʒəqillərə təsaduf olynyr və səhnədə bir çok ɵlumlər, kəhrəmanlьklar təsvir olynyr. İnsanda dəhʒətli bir tə'sir ojandьrьr. Mevzy isə ən bojuq ʒəxsijjətlərdən ƣoturulur. Qeçmiʒ zamanda drama varlь sьnfьn həjatьna yjƣyn jaradьlьrdь. By ƣunqu Ʒyra drama və faceələri, varlь sьnfьn butun alçaklьgьnь mejdana çьkarьr və əməqçi sьnьfьnьn galibijjətini ƣɵstərir.

T r a z e d i — dramaja bənzər əsərdur qi, baʒ rollarь və sajirəni ojnajan adamlar ən juqsəq kuvvət, arzь, agьl və hiss ilə baʒkalarьndan ajrьlarlar. Byrada kəhrəman, dəjiʒilməsi mumqun olmajan cəmijjət kanynlarьnь pozar. By iʒləri ƣɵrurqən, kəhrəman ɵluncəjə kədər mukəssirliƣini bojynyna almaz və ja da yzyn vakt baʒa duʒməz. Kəhrəman, kanynla çarpьʒmada çok əzab çəqər və nəticədə ɵzu də həlaq olyr. Kəhramanьn arzьlarь, muhitinin kyrylyʒyna yjƣyn ƣəlməz... Həjati və xəjali dramalarьn kəhrəmanь, ancak bir muhitdə olan ictimai kajdalarь jьkmak istədiƣi halda, trazedi kəhrəmanь, hər durlu itaət edilməsi lazьm ƣələn mutlək və dəjiʒməz kanynlarь jьkar.

K o m e d i j a — Jaʒajьʒda olan bir hadisəni ƣuldurərəq təsvir edən ojyna komedija dejilir. Komedija camaatьn əxlakьna və adə-

tinə yjgyn olmajarak, ƣərulən noksanları, xalk karşısında ƣuldurə-rəq ƣostərər.

Komedija muxtəlifdur: 1—tənkidi komedijadyr qi məzhəqə tərzində olar və camaat uçun korkyly olan noksanları ƣostərər. 2—ictimai əhəmijjəti az olan ƣulunc halları, təsvir edərəq camaatı, ƣuldurən komedijalardyr.

O p e r a — dramanın bam-başka bir şəqlidur. Operanın ƣedişi, mysiki ahənƣinə yjgynlaşdırılır. Hər operanın əzunə məxsys bir mysikisi vardyr. Operanın mevzyy dramanın mevzyy qibi xəjali və həjati olyr. Bizdə məşhyr operalar: Şah Ismajıl, Məşhədi Ibad, Şah Abbas-Xyrşid Bany, Əsli-Qərəm, Lejli-Məcnyn və sajirləridur.

*SYALLAR:*

*1—Teatroda nə cur əsərlər ojnanılır?*
*2—Drama nədur?... Qeçmişdə və indi nəji təsvir edir?*
*3—Trazedi nədur?.. By nə məksəd daşıjır?*
*4—Komedija hansı məksədləri ƣozləjir?*
*5—Komedija neçə kısımdyr?*
*6—Bildiƣiniz komedijaları sajın?*
*7—Opera nədur, məzmyny nədən ibarətdur?..*
*8—Bildiƣiniz operaları sajın?..*

**Azərbajcanda teatronyn mejdana ƣəlməsi.**

1849-ncy ildə Zakafkasija sərdarının əmrilə, ilq dəfə olarak teatro binası, Tiflis şəhərində tiqilmişdur. By teatronyn səhnəsində ojnanılacak əsərlər olmadığından, ryslardan ermənilərdən və turqlərdən ibarət bir komisjon duzələrəq lazım ƣələn əsərləri hazırlamak işlərinə başlamışlar. By komisjonda turqlərdən jalnız Mirzə Fətəli Axyndov var idi. Ehtijac karşısında Mirzə Fətəli əzu jeni əsərlər jazmaga başlajır və əmrunun axırına kədər əz əsərlərinin turq dilində ojnanmasını ƣərməqi arzı edir.

1878-nci ildə ilq dəfə olarak Hacı, Kara teatrosynyn Baqıda ojnanılması xəbəri eşidilir.

Axyndovdan sonra turq teatro əsərləri jazanlar: Nərimanof, Vəzirof, Hakverdijef, Cəlil Məhəmməd Kyly-zada, Husejn Cavid və sonra Cəfər Cabbarzada olmyşdyr.

O zaman muəjjən turq səhnəsi və turq aktjory, xusysyn turq aktirisası, jok idi.

Jazıçıların əsərləri ja heç ojnanılmajır və ja da evlərdə və sajirələrdə ojnanılırdı. Bir tərəfdən camaatın avamlıƣı, o biri tərəf-



dən cur-bə-cur lazım ƣələn vasitələrin joklyƣy, teatronyn irəli ƣetməsinə mane olyrdy.

Bir muddət sonra Azərbajcan zijalılarından ibarət həvəsqar dəstələri duzəlməƣə başlajır. Ancak by dəstələr içərisində bir nəfər də olsyn kadın tapılmazdı. Onların ojnacakları roly ərqəqlər ojnarlardı. Bynyn uçun əsqi teatromyz, çok zaman belə acı bir həjat qeçirməqlə jaşamışdyr. O zamanqı teatro, duzƣun və kismən meşşan ryhynda olan Iran və Turqijə teatrolarından çok da yzakda dejildi...

Turq teatrosynyn həkiki, ictimai və mədəni tarixi, Şyralar hoqumətindən sonra başladı. Az bir zamanda əlƣun həvəsqar teatrosy bojuq turq teatrosy şəqlinə ƣirdi. Teatro texnikymları açıldı. Muktədir aktjor kuvvəsi təşqil edildi. Işçi hoqumətı əsqi mədənijjətin butun əsaslarını, çuruqluƣilə əlinə topladı. Hər bir cəbhədə oldyƣy qibi byrada da sosjalizm mədənijjəti təməlini kyrdy. By zaman içərisində teatromyz rysların inkilabi əsərlərindən, əsqi ədiblərin jazılarından bir çok tərcumələr ala bildi. Jeni turq teatrosy Azərbajcanda bir çok teatro jazıçıları mejdana çıkarmaga muvəfiək oldy. By jolda bojuq muvəffəkijjətlər ƣostərmiş olan akademiq turq teatrosy çok irəlilərə ƣedə bilmişdur.

Mirzə Fətəlidən başlajarak by ƣunə kədər ƣəlmiş olan turq teatrosynyn 60 sənəliq bir tarixi vardyr.

*SYALLAR:*

*1—Azərbajcanda ilq teatro nə vakt ojnanmışdyr?*
*2—Ilq teatro jazıçılarımızı ƣostərin?*
*3—O zamanqı teatronyn vəzijjətini danışın.*
*4—Indiƣi teatro hakkında nə dejə bilirsiniz?*
*5—Teatromyzyn və səhnəmizin tarixini danışın.*

**Mirzə Fətəli Axyndov.**

Azərbajcanın muktədir teatro jazanlarından Mirzə Fətəli Axyndov, 1812-nci ildə Azərbajcanın Şəqi şəhərində anadan olmyşdyr. Mirzə Fətəlinin atası, iranlı olyb, ticarət məsələlərindən otru Şəqi şəhərində daimi syrətdə kalmaga məcbyr olmyşdyr. Laqın Mirzə Fətəli anadan oldykdan sonra atası butun ajiləsilə Irana donmuşdur. Bir neçə ildən sonra Mirzənin anası Nənəxanım, əz əmisinin janına kajıtmak uçun Şəqijə donməqi ərindən rəca edər. Atası, Mirzə Fətəli ilə anasını, Şəqidə olan əmisi Hacı, Əli Əsqərin janına ƣondərməqi kərara alar..

Mirzə, Şəqijə ƣəldiqdən sonra, əmisi Hacı Əli Əsqərin sə'ji ilə okymaga verilir. Bir muddət sonra əmisinin kızı ilə evlənir. Bynynla Mirzə Fətəli okymagını byrakıb o zaman çar hoqumətinin Şəqidə açmış oldygy mutərcimliq məqtəbinə daxil olyr. Byranı bitirdiqdən sonra. Mirzə, Şəqidə: kalmajıb Tiflisə hərəqət edir. Orada Kafkaz caniʃinin janında tərcuməçiliq vəzifəsi alır.



Mirzə Fətəli Axyndov.

Mirzə Fətəlinin ədəbi fəalijjəti by zamandan başlajır. Byrada rys lisanı vasitəsilə, Avropa ədəbijjatilə tanış olyr. Az bir zamanda İran və Zakafkasijanın hər tərəfində məşhyr olyr.

Mirzə Fətəli o zamanın nəzərijjələrinə və polis kanynlarına karşı bir çok dəfə çıkışda bylynyr. Jeni fiqir, jeni məksədlərlə mejdana çıkmış olan by ƣənc adam, əsqi musəlman cəmijjətləri ilə şiddətli syrətdə mubarəzə aparır. By cəmijjətin butun əxlak və tərbijələrinin nədən ibarət oldygyny mejdana kojyr. Jazılarında əlməz musəlman tipləri jaradır. Mədəni dunja karşısında əsqi ərəb əlfbasının ləgv edilməq məsələsini ortaja atır.

Turq ədəbijjat tarixində kijmətli olan by sima, tarixi ədəbijjatımıza bir neçə kijmətli əsərlər verrmişdur. Mirzə Fətəlinin jazmış oldygy «Hacı Kara», «Musjo Zordan», «Ibrahim Xəlil qimjaƣər», «Dərviş Məst Əli şah» «Vəzir xan Sarab», «Aldanmış qəvaqib» və ƣejriləri rys və fars dillərinə çevirməqdən başka fransız və alman dillərinə də tərcumə edilmişdur.

By kijmətli ədibimiz 1878-nci ildə Tiflis şəhərində vəfat etmişdur. O vəfat etdiƣi ƣun butun ryhanilər və musəlmanlar onyn cənazəsinə ƣetməqi kədəgən etdilər. Dərt beş nəfərdən ibarət olan əkrəbası, by kijmətli vucydy əbədi olarak topraklara tapşırdı.



Şyra hoqyməti kyryldykdan sonra, əməqçi xalk Mirzə Fətəlini kijmətləndirməqə başladılar. Onyn ortaja atdıgı və ancak nifrət və lə'nətlərlə karşılanmış olan jeni əlifba məsələsini, by ƣun həjata qeçirirlər.

Mirzə Fətəli naminə abidələr, hejqəllər japılır.

Mirzə Fətəli olmuş, laqin onyn namı olməjəcəq, onyn adı əməqçilərin urəqində əbədi jaşajacakdyr.

*SYALLAR:*

*1—Mirzə Fətəlinin həjatını sɵjləjin?*
*2—Mirzə Fətəlinin ədəbi fəalijjəti necə başlamışdyr?.*
*3—O, əsərlərində nədən bəhs edir?*
*4—Mirzənin ƣərməƣ istədiƣi işləri sajın?*
*5—Mirzə nə zaman və hansı xidmətlərdən sonra ɵlmuş?..*
*6—Zamanında Mirzə ilə necə rəftar olynmyşdyr?*

## Hacı Kara.

XIX əsrin xalk həjatı və nəzərijjələri Mirzə Fətəlinin jazmış oldygy əsərlərdə ajdın okynyr.

Mirzə Fətəli ɵz əsərlərində o zamanın tacirlərini mulqədarlarını, çinovniqlərini, əsnafları, mollaları, fırıldakçıları, bəjləri və sajirləri ƣɵstərmişdur. Mirzə Fətəlinin numynə ola biləcəq ɵlməz və baş əsərlərindən biri də «Hacı Kara»dyr.

«Hacı Kara» dakı tiplər. By əsərdə o zaman jeni mejdana ƣəlmiş ticarət byrzyazijasının ac ƣɵzluƣu və ɵz kijmətini itirmiş mulqədar sınıfının jaşajışı ƣɵstərilmişdur.

By komedijada mulqədar sınıfını ƣɵzəl syrətdə təsvir edən bir tip vardyr qi, o da Hejdər bəjdur. Hejdər bəj daima ɵz həmsɵhbətləri ilə əsqi və jeni kajda kanynlardan, nişan vyrmakdan ƣarətƣərliqdən sɵhbət edər. Naçalniqin ona əqinçiliq və ja ticarət ilə məşƣyl olması uçun etmiş oldygy məsləhəti sɵjlər. Hejdər bəj by sɵzləri o kədər həjəcanla danışır qi, əsqi bəjliq devri insanın nəzərlərində tamamilə canlanır.

Hacı Kara ac ƣɵz bir alverçidur. Var kuvvəsilə dɵvlətli olmaga çalışır. Ajiləsini bir karın ac, bir karın tox byrakıb hər cur fırıldak və jalan ilə mallarını satıb kaçak mal ƣətirməq uçun İrana ƣedər. Ɵzu avam bir adamdyr. Ɵz arvadına hejvana bakan qibi bakır.

Hacı Kara qibi adamların istibdad hөqumətinə səjcənərəq surunduƣunu, Mirzə Fətəli kədər bizə ajdın və aşqar ƣөstərən olmamışdyr.

O zaman hөqumətin ədalətsiz kanynlarını həjata qeçirməq uçun, tə'jin olynmyş kyllykçylar: naçalniq və pristavlar da pis təsvir olynmamışdyr.

By komedijaların dөrduncu məclisində ƣunahsız və taksırsız jerə həbs olynmyş qəntlilərlə naçalniqin danışıƣı ƣөstərilir. Byrada qəntlilər: «Rys silisti beş illərlə surur. Onların işinə bakılana kədər onlar өlərlər» dejirlər. O zaman qəntlilər naçalniqə başka cur bakırlar. Qəntlilərin hөqumətə karşı bəslədiqləri mudhiş korky, çar istibdadı nə dərəcədə ədalətsiz oldygyny ƣөstərir.

«H a c ı K a r a»d a k a d ı n t i p l ə r i . Mirzə Fətəli kadın məsələsini camaat həjatının tərəkki və inqişafı ilə sıkı və mөhqəm syrətdə baglajır.

«Hacı kara»da təsvir olynan Sona xanım, Hejdər bəjin nişanlısı, olyb əsqi adətləri tapdalajan səbatlı və davamlı bir kadındyr. Ujecə jarılarında belə heç bir şejdən korkmaz, laqin təəssuf qi savadsız və dar fiqirlidur. Amma nə kədər avam olsa da, həjatın nə kədər baha oldygyny kijmətləndirir.

Sonra xanım zirəq və hazırcavabdyr.

Umymijjətlə Mirzə Fətəlinin jaratdıƣı kadın tipləri, avam, laqin saf kadındyrlar.

«Hacı Kara» əsərində iqinci kadın tipi, Hacı Karanın arvadı, Tuqəzdur. Tuqəzin zamanında kızlar, koçy adamları, sevərmişlər. Laqin, Tuqəz bynlardan yzakdyr. Ərini kaçaklıga ƣetməqdən korxyjyr. Tuqəz cəsarətli və korkmazdyr. Tuqəzin by xasijjətləri Hacı Karının dediƣi sөzlərdən anlaşılır.

Hacı Kara tufənq, tapanca ilə ojnadıkda, Tuqəz: «by tufənq tapancanın şirmisini ustumə kaldırsan, mən arvadlıƣım ilə səndən korkmaram» dejir.

Tuqəz ilə onyn arasında olan danışıklardan maraklısı bydyr: qişi: «mən dunjada qimsəni incitməmişəm qi, murdar olym» dediqdə, Tuqəz: «bir qimsəjə zərər verməmiş, amma xejir də verməmişsən. Ondan otru murdarsan qi өz malını nə өzun jejirsən, nə də əjalına sərf edirsən» dejir. By sөzun həjat uçun nə kədər yjgyn və kijmətli oldygy aşqardyr.

Tuqəzin dili və fiqri kuvvətlidur.

Hacı Kara, «arvad-yşagım zəhirmar jesin!» dediqdə Tuqəz: «sənin evində zəhirmar da tapılmaz» dejə dəjərli cavab verir. By tiplərlə Mirzə Fətəli, ƣələcəqdə kadınların azad olması ilə elm və



mədənijjət jolynda cəmijjət həjatına nə dərəcədə mənfəətlər verəcəƣini ƣөstərməq istər.

Jykarı nucəba sınfının ejiblərini, agılsız və duşuncəsizliƣini, çirqin adətlərini, çuruqluqlərini, iqi uzlu və tamahqarlıklarını, by komedija, tamamən açmışdyr.

Mirzə Fətəli, əsərlərini ƣeniş xalk qutləsinin anlaja biləcəƣi sadə bir dillə jazmışdyr.

*SYALLAR:*

*1—«Hacı Kara»da kəhraman tiplər qimlərdən ibarətdir?*
*2—Mirzə Fətəlinin kadına bakışını sөjləjin?*
*3—Mirzə Fətəlinin lisanını və sajir kijmətlərini sөjləjin.*
*4—Azərbajcan əməqçi xalkı və Mirzə Fətəli?*

———

# XVII

# PRAKTIQ IƷLƏR NUMYNƏLƏRI.

## Ərizə numynələri.

*«S» qənt əhalisi tərəfindən.*

## ƏRIZƏ.

*Azərbajcanın ʒəhərləri və qəntləri ƣet-ƣedə eleqtiriq ıʒıƣı ilə ıʒıklanır. Bizim qənt isə, zylmat içindədur. Zylmatdan kyrtarmak uçun qəndimizin janından akan çajdan istifadə etməq mumqundur. Bizim qəntlilər, by ərizəmiz ilə baʒka mədənijjətli qənt qibi bizim də eleqtiriq ıʒıƣı ilə ıʒıklanmaƣımız uçun qəməqdə bylynmanızı təvəkke' ediriq. Sizin bizə edəcəƣiniz qəməƣə karʒı biz dəxi var kuvvəmiz ilə çalıʒacaƣımıza səz veririq.*

**Imzalar:**

*Qənt ʒyrası, imzaları təsdik edir:*

**Sədr:**

## Vəqalətnamə.

Mən Əhməd Husejnov Lenin fabriqi kassasından ijyn ajı maaʒını almak uçun vətəndaʒ Rəhimovy vəqil edirəm.

By xusysda imza etdim:

**Imza:**

Ə. Husejnovyn imzası təsdik olynyr.

**Fabzavkom sədri:**

**Mohur jeri**

## Kəbz.

«N» qəndində olan malarija naxoʒlygilə mubarəzə uçun qəntlilərə pajlamakdan ətru sihhijjə komisarlıƣından bir qilo xinin dərmanını aldım.

**«N» qəndi feldʒeri:**



## ICLAS XUSYSYNDA.

### Bildiriʒ.

Bibi-Hejbət dajirəsinin byryg ʒo'bəsi nəzdindəqi, Volodarsqi namına klybda avgyst ajının 12-ndə akʒam saat 7 tamamda jolykma xəstəliqləri və onlarla mubarəzə hakkında, doktyr Qazımof tərəfindən turq dilində muhazərə olacakdyr. Muhazərədən sonra «Bismillah» qinosy tamaʒaja kojylacakdyr. Turq iʒçilərinin ƣəlmələri lazımdyr.

*Mədəni məarif komisiony.*

### Akt

1928-nci ilin 10 majında Əli Həsənof, Gylam Əhmədov və Nəsir Kylyjevdən ibarət olan komisjon zavod komitəsinin kassasını təftiʒ etdi. Nəticədə kassada iʒlər və lazımi orderlər jerli jerində duzƣun oldygy, laqin nəkd paradan iqi juz altı manat çatmadıƣı ƣoruldu. Xəzinədarın ƣostərdiƣinə ƣorə, by paralar idarə uçun alınmıʒ olan ləvazımata sərf edilmiʒ; laqin hələ kəbz alınmamıʒdyr. Komisjon by iʒin butun məs'ylijjətinin xəzinədarın ohdəsinə duʒməsini kərara alır:

**Komsion uzvləri:** { 1 2 3

## Məqtyb numynələri.

(Neft mə'dənində iʒləjən bir iʒçinin joldaʒına məqtyby).

*Əziz joldaʒım Səlim!..*

*Çokdan sizə ƣondərdiƣim uç qaƣızdan bir xəbər ala bilmədim. Kardaʒım!... nə var nə jok, qəndimiz səlamətdurmu?.. Mən, Baqı neft mə'dənində dartajçılık iʒi ilə məʒgylam. Əzun bilirsən qi, qeçmiʒlərə nisbətlə indi iʒlərimiz çok ƣozəldur. 18 saat iʒlədiƣimiz ƣunlər, indi jokdyr. Ƣundə 8 saat iʒləjib byndan sonra da cur-bə-cur təʒqilatlarda əz mə'lymatımızı artırmak uçun çalıʒırık. Hələ by jakınlarda daha da azaltmak uçun, iʒ ƣununu 7 saata çevirirlər. Bizə çok ƣozəl rahat otaklar veriblər. By jakınlarda bizi və bir neçə joldaʒımı, iʒçi sanatorjasına ƣondərməq uçun adımızı jazdılar. Hər halda jakında sizə iqinci məqtybymy sanatorjadan jazacaƣam. Duʒmənlərimiz javaʒ-javaʒ kırakdan baʒ kaldırır. Bizim qibi namysly iʒçilər, ƣərəq iʒçi sınfının rəhbəri olan kommynist firkəsınə daxil olsynlar. Bynyn uçun mən indi kommynist firkəsinə ƣirdim. Əzumdən xoʒbəxt adam dunjada jokdyr, zənn edirəm.*

*Məndən kohym kardaʒlara və qəntdə olan butun joldaʒlara salam səjlə. Qəndimizin halından və ɵz jaʒajıʒından mənə tez-tez qagız jaz.*

*Joldaʒlık salamilə:*

*Sizin Həmid Kylyjev*

*Baqı, 28—VI—28 il.*

### Səlimdən Həmidə.

*Joldaʒ Həmid!*

*Çokdan bəri ƣɵzlədiƣim qagızın ƣəldi. Uç qagız ƣɵndərdiƣini jazırsan; hal by qi, bizə jalınız axırıncı qagızın çatdı. Məndən xəbər soryrsan, nə jazım bilməjirəm. Sənin xoʒbəxtliƣin məni və joldaʒlarımı çok ʒad etdi. Bizim qəntdə hɵqumət məqtəb və ƣecə kyrsları açdı. Vaktımın qeçməsinə bakmajıb, mən də kyrsa okymak uçun ƣetməƣə baʒladım. Məni by iʒə vadar edən sənin qagızların oldy. Çunqu bir məqtybyny okymak uçun nə kədər zəhmət çəqdiƣimi ancak ɵzum bilirəm. Qəndimiz indi jakʒılaʒmıʒdyr. Traktorymyz var. Əqin iʒlərimizi indi onynla aparırık. By jakınlarda qəntdə qənt təsərrufat bankı açılmıʒdyr. Hamı oraja uzv jazıldı. Hər bir lazım olan ʒeji oradan alırık. By ilqi məhsylymyz əvvəlqilərə nisbətən birə iqi artmıʒdyr. By məqtybi qəndimizin muəllimin jazdırdım. Butun tanıʒların və kohym-konʒyların salamətdur.*

*Kardaʒın Səlim.*

28-V-28 il.

### Vəsikə forması.

By vəsikə sahibi joldaʒ Kylyjev Agdam kəzasının «B» qəndində bədən tərbijəsi iʒləri təʒqil etməq uçun ƣɵndərilmiʒdur. Butun təʒqilatlardan bədən tərbijəsi iʒlərində jaldaʒa qɵməqliqdə bylynmaları rəca olynyr.

**Kəza maarif ʒɵ'bəsi**
**mudiri: Imza.**

Mɵhur jeri.

Qatib: **Imza.**

### Rəsmi qagız numynəsi.

AGDAM KƏZA ICRAIJJƏ KOMITƏSI SƏDRINƏ.

29-aprel tarixli 4903 numrəli tə'likənizə cavab olarak mə'lym edirəm qi, Xocalı qəndində tə'mir olynacak məqtəb binası uçun qafi



mikdarda daʒ, kym və qirəc qəndin əhalisi tərəfindən hazır edilmiʒdur.

Həmin ləvazımat, toprak komitəsi, məqtəb binası uçun ajırdıgı jerdədur. Məqtəb binasının tə'cili syrətdə tə'mirinə baʒlanması xusysynda lazımi təʒəbbusatda bylynmanızı rəca edirəm

**Xocalı qənt ʒyrası sədri:** *Məhəmmədzadə.*

**Q a t i b:** *Vəiizadə.*

Numrə 174

17 avgyst 1928 il.

### Telegraf numynəsi.

*Baqı, Lenin fabriqində Əhməd Həsənova. Anam azurlıdyr, tez qəl.*

*Vəli.*

## BƏRATULKEVL №8.

### Bəratulkevl kopijasından numynə.

1928-nci ildə aprel ajının 5-ndə Agdam kəzası «B» qəndi əhalisinin umym jıgıncagının bəratulkevli.

**Gundəliq məsələlər:** 1—Qəntdə olan malarija xəstəliqinin aradan kaldırılması uçun mərqəzdən qɵməq istənilməsi barədə.
2—Cari məsələlər.

Sədr: **Əhmədli.**
Qatib: **Rahmanov.**

| **Eʒidildi:** | **Kərarə alındı:** |
|---|---|
| Birinci məsələ barəsində joldaʒ Həsən Məhəmməd ogly qəntlilərə qəntdə olan malarijanın verdiƣi jamanlıklardan danıʒıb, tezliqlə hɵqumətdən qɵməq istənilməsini bildirdi. | Mə'ryzə barəsində bir çok qəntlilər çıkıʒda bylyndykdan sonra, bir səs ilə aʒagıdaqı kərar kəbyl edilir: qəndimiz bataklık kıragındadyr; isitmə milçəqləri qəntdə malarija xəstəliƣini mejdana qətirirlər. By azardan əhalinin həm ɵzu və həm də mal karası çok zijan çəqir. Qənt əhalisinin vəzijjətini nəzərə alıb, qəndimizdə bir feldʒer mintəkəsi açılmasını və bataklıgın kyrydylmasını kəza Icraijjə komitəsindən rəca ediriq. |

**Sədr:** *Əhmədli.*
**Qatib:** *Rahmanov.*

